## ALLAHA ETİQAD

### Etiqadın tərifi

Etiqad – nəfsləri haqqa yönəldən, qəlblərə rahatlıq bəxş edən, öz sahibi üçün tamamilə yəqin, hər hansı bir şəkk və şübhədən uzaq olan baxışlar sistemidir. İslamda əqidə ilə şəriət yanaşı durur. Belə ki, islam əqidə və şəriətdir. Şəriət islamın ibadət və qarşılıqlı münasibətlər sahələrində irəli sürdüyü əməli vəzifələri əhatə edir. O, elmi (nəzəri) xarakterdədir. Hər bir müsəlman onu öz qəlbində tam bir yəqinliklə qəbul etməlidir. Çünki Allah onu bu etiqad barədə Rəsulullaha (s.a.v.) göndərdiyi vəhylərlə xəbərdar etmişdir. Rəsulullah (s.a.v.) Cəbraillə (Ona salam olsun!) bağlı məşhur hədisində Allahın bizə qəbul etməyi əmr etmiş olduğu əqidənin əsaslarını açıb göstərir: *"İman – Allaha, Onun mələklərinə, kitablarına, peyğəmbərlərinə, qiyamət gününə, qəza və qədərin Allah-təaladan nazil olmasına inanmaq deməkdir"* (Müslimin rəvayəti).

Baxışların etiqad olması üçün biz onların həqiqət olmasını qətiyyətlə təsdiq etməli, onlarda şübhə yeri qoymamalıyıq. Əgər onlara şübhə olsa, onlar etiqad deyil, daha çox mülahizə ola bilərlər. Allah-təalanın bu kəlamı dediklərimizə dəlildir: **"Möminlər Allaha və Onun peyğəmbərinə iman gətirib şübhə etməyənlərdir"** (əl-Hucurat, 15).

Allah-təala həmçinin buyurur: **"Bu elə bir kitabdır ki, onda şəkk-şübhə yoxdur"** (əl-Bəqərə, 2). Həmçinin: **"Sən şəkk-şübhəyə yer olmayan bir gün üçün insanları cəm edənsən"** (Ali-İmran, 9). Şübhə edən, şəkk gətirən müşriklərin günahı budur ki, **"qəlbləri şübhə ilə doludur, onlar öz şəkk və şübhələri içində tərəddüd edirlər"** (ət-Tovbə, 45).

### Bu gün səhih etiqad varmı?

Bu gün səhih etiqad yalnız islamdadır. Çünki o, Allahın qoruduğu, mühafizəsini təmin etdiyi dindir: **"Biz zikr nazil etdik və biz də onu hifz edirik"** (əl-Hicr, 9).

İslamdan kənarda olan etiqadlarda hətta az miqdarda həqiqət olsa da, onlarda haqq və aydınlıq ola bilməz.

### Etiqadın əhəmiyyəti

İslam etiqadı insana hava və su kimi lazımdır. Bu etiqaddan məhrum adam yolunu azmış, özünü və varlığını itirmiş olur. Yalnız İslam etiqadı insanı narahat edən bütün suallara cavab verir. Bu suallar insanı heyrətə salır: Mən haradan gəlmişəm? Bu varlıq haradan gəlmişdir? Yaradan kimdir? Onun sifətləri və adları nədir? Biz və bu varlıq nə məqsədlə yaradılmışdıq? Bizim bu kainatda yerimiz haradadır? Bizi yaradan Xaliqlə əlaqəmiz necədir? Bu gercək aləm arxasında gözlə görünməyən amillər vardırmı? Orada bu insandan başqa ağıl və düşüncəyə malik canlı varlıqlar varmı? Bu həyatdan sonra bizim yaşayacağımız başqa bir aləm varmı? Əgər bu suala müsbət cavab verilirsə, onda bu həyatın mahiyyəti necədir?

Bu gün islamdan başqa bütün bu suallara həqiqi, doğru və qənaətbəxş cavab verən bir etiqad yoxdur. Bu etiqadı qəbul etməyən və ona sahib olmayan adam yol azmış hesab olunur. İman yalnız etiqad demək deyildir. Etiqad imanın əsası və köküdür. İman insan qəlbində mətinləşmiş, zəruri, ayrılmaz bir etiqaddır. Etiqad sahibi qəlbində sakin olan etiqadını öz dili ilə ifadə edir, öz etiqad və deyimlərini əməldə bu əqidənin zəruri tələblərini nəzərə alaraq təsdiqləyir.

Qəlbə hakim kəsilən, lakin əməldə zahir olmayan etiqad boşdur, soyuqdur. O heç də əqidə adını daşımağa belə layiq deyildir. Biz çoxlarının həqiqəti bildikləri halda ona mültəzim olmadıqlarına, öz həyatını ona uyğun şəkildə qurmadıqlarına şahidik. Əksinə, onlar yəqin olan həqiqətə qarşı çıxırlar. İblis də ən böyük həqiqəti tamamilə yəqin etmişdi, Allahı tanıyırdı, peyğəmbərlərin və kitabların haqq olduğunu bilirdi. Lakin o özünü bildiyi haqqa qarşı mübarizəyə həsr etmişdi. Firon da Musanın göstərmiş olduğu möcüzələrin Allah dərgahından olması ilə razı idi. Lakin o, təkəbbür göstərib Allaha qarşı çıxdı. Allah-təala onun barəsində buyurur: "(Möcüzələrimizin) **həqiqiliyinə**

**daxilən möhkəm əmin olduqları halda, nahaq yerə və təkəbbür üzündən onları inkar etdilər”** (ən-Nəml, 14).

Deməli, iman, sadəcə olaraq Allahı tanımaq və yaxud onu iqrar etməkdə təkəbbür göstərmək, Onun hökmlərinə tabe olmağı rədd etməklə bir araya sığa bilməz. İman, sahibinin qəlbinin razılığını qazanmış etiqaddır ki, onu dili ilə ifadə edir, Allahın onunla bağlı olaraq göstərdiyi yolla razılıqdır. Buna görə də sələfi alimlər demişlər: “İman qəlbdə etiqad, dildə ifadə və rüknlərə əməl etmək deməkdir”.

**Etiqadın şəriətlə bağlılığı**

İman, münbit torpağa dərin kök atmış məhsuldar bir ağac kimidir. Bu ağac göylərə yüksəlmiş, çiçək açmış və meyvəlidir. O öz meyvələrini Rəbbinin izni ilə insanlara bəxş edir. İman həm də bu ağac kimi sahibinin qəlbinin dərinliklərinə kök atmış etiqaddır; onun gövdəsi, budaqları və meyvələri isə əməldir. Heç bir şübhə yoxdur ki, köklər kəsilərsə və ya yerdən çıxarılarsa, ağac quruyar və məhv olar. Əgər etiqad itirilərsə, iman da məhv olar, mövcud olmaz. Gövdə və budaqlar bütünlüklə kəsiləndə ağac zəifləyir, quruyur və məhv olur. Çünki budaqların və yarpaqların mövcudluğu ağacı yaşatmaq üçün zəruridir. Əgər əməllər də yerinə yetirilməzsə və ya yalnız bir hissəsi həyata keçirilərsə, onda iman da naqisləşəcək və itiriləcəkdir.

**Bu risalənin metodu**

Bu risalədə biz əqidə probleminin şərhində Qurani-Kərim və Sünnənin göstərdiyi yolu rəhbər tuturuq. Bu yoldan kənara çıxa bilmərik, çünki o, müsəlman ümmətinin ilk nümayəndələrinin tutduğu haqq yoludur.

**Allaha iman**

Etiqadın kökü Allaha imandır. Bu ən mühüm etiqad və əməl prinsipi olub islamda özünəməxsus bir yerə malikdir. O, Quranın məğzidir. Mübaliğəsiz deyə bilərik ki, Quran bütünlüklə bu mövzuya həsr edilmişdir. Quran –Allah-təala, Onun zatı, adları, sifətləri, əməlləri barədə, Kursi ayəsində və ya İxlas surəsində olduğu kimi, birbaşa söhbət, yaxud şərik qoşmadan yalnız Ona ibadət etməyə, Ondan başqa batil ilahilərə ibadətdən əl çəkməyə çağırışdır. Bütün bunlar Allahı tanımaq, Onun haqqına mültəzim olmaq və bunları Ondan qeyrisinə aid etməyə yol verməmək deməkdir. İman sahibləri, onların bu dünyadakı etdikləri əməllər və axirətdəki qazancları barədə xəbərlər - bütün bunlar Allahın iman sahiblərinə bəxş etdiyi mükafatlardır.

Allah-təalanın Onun dininə düşmən kəsilənlər, onların bu dünyada etdikləri pis işlər və bu işlərin müqabilində axirətdə dadacaqları əzablar barədə verdiyi xəbərlər isə özündə imandan heç bir zərrə toplamamış məlun kafirlərə veriləcək cəzadır. Quran bütünlüklə Allaha iman barədə söhbətdir. Biz Quranda Allah-təalanın hər səhifədə orta hesabla 20 dəfə və ümumiyyətlə 10062 dəfə adlarından və sifətlərindən biri ilə xatırlandığını görürük.

### ALLAHI TANIMAQ, QƏLBİN ONUNLA BAĞLILIĞI

Quranda deyilənlərin mənasına vardıqda səmanınənginliklərinə və yerin ən dərin qatlarına baş vurur, gül-çiçəklərə bürünmüş çölləri, ən uzaq ulduzları gəzir və bütün bunlarda Allahın qüdrətinin, Onun yaratdıqlarına verdiyi qiymətin şahidi oluruq, yaradılış və varlığın sirrləri isə bizi heyrətə salır. Bu səyahət bizi yaradıb-qurmaqda hökm sürən hikmətə doğru yönəldir, ətraf kainatda bizim nəfslərimizə və cismimizə bəxş edilmiş nemətlərin şahidi edir. Bu həm uzun, həm də qısa surələrlə uzanan geniş bir söhbətdir ki, nəfsi özünə cəlb edir, qulağa xoş gəlir, şüura və hisslərə müsbət təsir edir. Elmin və alimlərin həyatın bir çox sahələrində əldə etdiyi nəticələr varlığın bir çox sirlərini aşkar edir və bu yaradılışın bir Yaradanı olduğunu göstərir. Bütün bunların içində elə bir məsələ yoxdur ki, Quranda tam şəkildə şərh edilməsin, öz kamil elmi həllini tapmasın, insan şüuruna hakim kəsilməsin, onu haqq yoluna yönəltməsin və dəqiq nəticələr əldə etməsin. Başqa cür ola da bilməzdi: çünki bu, böyük mərhəmət və hikmət sahibi Allahın nazil etdiyi kitabdır.

**ALLAHIN KAİNATDA FƏALİYYƏTİ**

Gəlin indi də Quran ayələri ilə bu kainata səyahətə çıxaq ki, Allahın qüdrətinin varlığın müxtəlif sahələrində özünü necə göstərdiyini görək.

Torpağa atılan toxum parçalanır və kök atır. Quru toxumdan özünü gövdədə, yarpaqlarda, güllərdə büruzə verən həyat meydana gəlir, ətrafa xoş ətir yayılır, insan və heyvanlara yem olan meyvələr yetişir. Səhər hava açılır... Gecə sükunət çökür... Günəş və ay öz yolunu keçir... **"Allah toxumu və çərdəyi cücərdir, ölünü dirildir, dirini isə öldürür. Bütün bunları yaradan Allahdır! Siz Ondan necə üz döndərirsiniz?** (Gecənin zülmətindən) **sübh işığını yaradan, gecəyə sükunət çökdürən, günəş və ayın hərəkətini bir ölçü vasitəsi edən Odur.** (Bütün) **bunlar elm və qüdrət sahibinin hökmüdür"** (əl-Ənam, 95-96).

Buludların mənzərəsinə bax! Allahın onları və yağışı xəlq etməsi və ondan istifadə etməsi barədə Quranda belə deyilir: **"Məgər görmürsənmi ki, Allah buludları qovub bir yerə toplayar, üst-üstə yığıb topa halına salar. Görürsən ki, buludlar arasından yağış yağar, sonra Allah göydən nəhəng dolu yağdırar. İstədiyi adamı onunla bəlaya düçar edər, istədiyindən isə onu sovuşdurar. Buludların şimşəyinin parıltısı az qala gözləri kor edər"** (ən-Nur, 43).

Allah kölgədə öz əməli barədə buyurur: **"Məgər Rəbbinin kölgəni necə uzatdığını görmürsənmi? Əgər istəsəydi, onu daim öz yerində saxlayardı. Sonra Biz günəşi** (kölgəyə) **bir dəlil etdik. Bundan sonra kölgəni yavaş-yavaş Özümüzə tərəf çəkdik"** (əl-Furqan, 45-46).

Onun həyat, canlı varlıq, gecə və gündüz işlərini idarə etməsinə bax: **"De: Ey mülk sahibi Allahım! İstədiyin adama mülk verirsən, istədiyindən də alırsan. İstədiyini yüksəldir, istədiyini isə alçaldırsan. Xeyir Sənin əlindədir. Sən hər şeyə qadirsən! Gecəni gündüzə, gündüzü isə gecəyə qatırsan, ölünü dirildir, dirini isə öldürürsən. İstədiyin şəxsə saysız-hesabsız ruzi verirsən"** (Ali-İmran, 26-27).

Quran Allahın qüdrətini, Onun kainatda əməli təzahürünü, bütün varlığı əhatə edən elmini, müxtəlif işlərdə Onun idarəetmə tərzini göstərməklə kifayətlənmir, o, həmçinin, kainatın nə məqsədlə yaradıldığı barədə bizə bilik verir. Allah səmalarda olanları bizim təbiətimizə, bədən quruluşumuza və mənafeyimizə uyğun bir şəkildə yaratmışdır ki, Quranda bu təsxir (tabe etmək) adlanır. Quran bu barədə sadəcə məlumat vermir, həm də Allahın ən kiçik hissəciklərdə belə yaratdığı bu tabeçiliklə bizi yaxından tanış edir. Belə ki, ulduzlar həm quruda, həm də dənizdə onların vasitəsi ilə yol tapmaq üçün yaradılmışlar: **"Qurunun və dənizin zülmətində doğru yolu tapmaq üçün ulduzları sizin üçün yaradan Odur. Biz bu ayələri elmli adamlar üçün izah etdik"** (əl-Ənam, 97).

Yer, göy, göydən yağmur endirməsi, gəmilərin üzdüyü dənizlər, yerin dərinliklərilə axan çaylar, günəş, ay, gecənin gündüzü əvəz etməsi... – bütün bunlar bizim xeyrimizə, bizim mənafeyimizə uyğun olaraq yaradılmışdır. **"Göyləri və yeri xəlq edən, səmadan yağmur tökən, onunla sizin üçün ruzi olaraq** (cürbəcür) **meyvələr yetişdirən, Öz əmri ilə dənizdə üzmək üçün gəmiləri sizə tabe və çayları sizə ram edən Allahdır! Öz çevrəsində daim seyr edən Günəşi və Ayı, gecə və gündüzü sizə tabe etdirən Odur. Allah istədiyinizin hamısını sizə bəxş etmişdir"** (İbrahim, 32-34).

**ALLAHIN NEMƏTLƏRİ**

Quran Allahın bu kainatı yaratdığını, onu bizim ixtiyarımıza verdiyini, ona insan həyatı üçün yararlı bir qüdrət bəxş etdiyini öyrədir. Quran bununla insana öz Rəbbinə tərif və təşəkkür yolunu göstərir. Çünki insan da öz hamisinə, ona xeyirxahlıq edənə fitri məhəbbət hissinə malikdir: **"Yaxşılığın əvəzi ancaq yaxşılıqdır"** (ər-Rəhman, 60). Buna görə də Quran Allahın öz bəndələrinə bəxş etdiyi nemətləri xatırladan ayələrlə zəngindir: **"De: "Sizi heçdən yaradan, sizə qulaq, göz və qəlb verən Odur. Siz isə az şükür edirsiniz"** (əl-Mülk, 23).

İnsanı əhatə edən kainat barədə isə deyilir: «**O Allah ki, yeri sizə beşik etdi, orada yollar saldı ki, istədiyiniz yerə düzgün gedə biləsiniz. Göydən sizə** (kifayət qədər) **su endirdi ki, biz onunla ölü bir ölkəni dirildik. Siz də bu cür diriləcəksiniz. O, hər şeyi cüt xəlq etdi, mindiyiniz gəmiləri və heyvanları yaratdı ki, onların belinə minib oturanda Rəbbinizin sizə verdiyi nemətləri yada salaraq deyəsiniz: "Bunları bizə ram edən Allah pak və müqəddəsdir!** (Əgər Allahın köməyi olmasaydı) **bizim onlara gücümüz çatmazdı"»** (əz-Zuxruf, 10-13).

Günəş və yeri bizim mənafeyimizə və ehtiyacımıza uyğun yaratmışdır: **"Günəşi işıqlı, ayı nurlu edən, illərin hesabını biləsiniz deyə, Ay üçün mənzil müəyyən edən Odur"** (Yunus, 5). Dəvə, inək, qoyun, at, qatır, ulağ kimi heyvanları bizə xeyir vermək üçün bizim təbiətimizə və bədən quruluşumuza münasib olaraq yaratmışdır: **"Ev heyvanlarını** (davarı) **da sizin üçün O xəlq etdi. Bunlarda sizə istilik, cürbəcür mənfəət vardır, onlardan siz yeyirsiniz. Onları səhər naxıra, axşam axura gətirəndə zövq alır, sevinirsiniz. Sizin yalnız əziyyətlə çata biləcəyiniz yerə yüklərinizi daşıyan onlardır. Sizin Rəbbiniz şəfqətli və mərhəmətlidir! O sizin minməyiniz üçün atı, qatırı və uzunqulağı yaratdı. Allah hələ sizin bilmədiyiniz neçə-neçə şeylər də yaradacaqdır"** (ən-Nəhl, 5-8).

Dəniz də bizim üçün yaradılmışdır. Onu yaratmaqla bizim mənafeyimiz çox cəhətdən tamamilə nəzərə alınmışdır: **"Təzə ət** (balıq əti) **yeməyiniz, ondan bəzək çıxarıb taxmağınız üçün dənizi sizin ixtiyarınıza verən Odur. Onun nemətlərindən ruzi axtarmaq üçün gəmilərin onu** (suyu) **yara-yara üzdüyünü sən görürsən. Bəlkə, şükür edəsiniz!"** (ən-Nəhl, 14).

Hətta bal arısını Allah insan mənafeyini nəzərə alaraq yaratmışdır: «**Rəbbin bal arısına belə vəhy etdi: "Dağlarda, ağaclarda və insanların qurduğu yerlərdə özünə yuva tik. Sonra bütün meyvələrdən ye və Rəbbinin sənə göstərdiyi yolla rahat, asanlıqla get!" O arıların qarınlarından insanlar üçün şəfa olan müxtəlif rəngli bal çıxır. Şübhəsiz ki, bunda da düşünüb dərk edənlər üçün bir ibrət vardır!**» (ən-Nəhl, 68-69).

Əməl onu edənin qüdrətinin güzgüsüdür. Çox dəqiq şəkildə və yüksək zövqlə düzəldilmiş, öz qüvvət və mətanəti ilə seçilən bir cihaz öz işini ən uğurlu bir tərzdə yerinə yetirir. Çox da fikirləşmədən bilməliyik ki, onu yaradan həyat və elm kimi sifətlərə malikdir, Onun qüdrət və iradəsi vardır və i.a. Bu varlıq onu Yaradanın çoxsaylı sifətlərini nümayiş etdirir və tanıdır.

**ALLAHIN QÜDRƏTİ VƏ ELMİ**

Bu nəhəng, böyük, ucsuz-bucaqsız və son dərəcə dəqiq bir nizamla hərəkət edən kainatın sonsuz qüdrət və bilik sahibi olan bir Xaliqi olmalıdır. Allah bu cür nəhəng həcmə və kamil nizama malik xilqəti öz qüdrətini və elmini bizə bildirmək üçün yaratmışdır: **"Yeddi səmanı və onun mislində olan yeri yaradan Allahdır. Allahın hər şeyə qadir olduğunu, Onun hər şeyi elmi ilə əhatə etdiyini biləsiniz deyə, Allahın əmri onların arasında** (mövcud olan bütün məxluqata) **nazil olar"** (ət-Təlaq, 12). Bu kainatı idarə edən elm geniş və tam əhatəli olmalıdır: **"Qeybin açarları Onun əlindədir. O, quruda və dənizdə olanların hamısını bilir. Onun xəbəri olmadan heç bir yarpaq belə düşmür. Yerin zülmətləri içində elə bir toxum, elə bir yaş, elə bir quru şey yoxdur ki, açıq-aydın kitabda olmasın!"** (əl-Ənam, 59).

**ALLAH HİKMƏT SAHİBİDİR**

Bu kainata diqqətlə baxan görər ki, o möhkəmdir, mətindir, hər şey öz yerindədir, məxluqlar da münasib saydadır, tam və kamildir: **"Sən dağlara baxıb onları hərəkətsiz zənn edəcəksən, əslində onlar bulud kimi keçib gedəndirlər. Bu, Allahın tam keyfiyyətlə gördüyü işdir. O, doğrudan da etdiyiniz bütün işlərdən xəbərdardır"** (ən-Nəml, 88).

Başqa bir mübarək ayədə isə deyilir: **"O, hər şeyi ən gözəl bir şəkildə yaratdı, insanı** (Adəmi) **palçıqdan yaratmağa başladı"** (əs-Səcdə, 7).

Allahın xilqət əməlinə dərindən və bəsarətlə nüfuz edən adam burada tam

kamillikdən, ən yüksək keyfiyyətdən başqa bir şey görməyəcəkdir. Əgər o nöqsan axtarsa, bu işdə aciz qalacaqdır: **“Yeddi göy təbəqəsini yaradan Odur. Sən Rəhmanın yaratdıqlarında heç bir uyğunsuzluq tapa bilməzsən. Gözünü qaldırıb diqqətlə bax. Orada heç bir çat görə bilərsənmi? Bundan sonra yenə də, dəfələrlə bax. Göz** (nöqsan və ayıb görməyib) **zəif, yorğun düşərək yenə də sənə tərəf qayıdacaqdır”**. (əl-Mülk, 3-4).

**Dəlillər vasitəsilə Allahın tanınması**

Allahı bizə tanıdan ikinci yol Quran və hədis mətnləridir ki, bunlarda Allah Özünün ad, sifət və əməlləri barədə birbaşa söhbət açır, bizə haqqın yolunu göstərir. Bu, nurlu, sonu əmin-amanlıq olan bir yoldur. Çünki Allahı Onun Öz kəlamı və rəsulunun kəlamı ilə tanıdıqda şəkk-şübhə üçün yer qalmır.

**Allahın sifətlərinin ağılla dərk edilməsi imkanı**

Quranda və Peyğəmbərin (s.a.v.) sünnəsində bəhs edilən Allahın sifətləri iki növdür:

1. İnsan ağlının bilib, lakin özlüyündə, yəni mətnlərsiz dərk etməkdə aciz olduğu sifətlər. Məsələn, Allahın üzünün və iki əlinin olmasının isbatı.

2. Ağılla sübuta yetirilə bilən sifətlər. Bura Allahın qüdrət və hikmətlə vəsf edilməsi daxildir. Biz aşağıda qarşıya qoyduğumuz məqsədə çatmağa imkan verəcək bir çox sifətləri qeyd edəcəyik. İzahımız, inşəallah, kifayətedici olacaqdır.

**1. Allahın zatı vardır**

Allah-təala kamil və hər hansı nöqsanla heç bir əlaqəsi olmayan sifətlərlə vəsf edilən zata malikdir. Quranı oxuyan hər kəs Allahın zata malik olması barədə mükəmməl bilik əldə edir: **“Allahdan başqa tanrı yoxdur. Əbədi və əzəli varlıq Odur. O nə mürgü, nə də yuxu bilər...”** (Əl-Bəqərə, 255). **“De ki: Allah birdir. Allah** (heç nəyə, heç kəsə) **möhtac deyildir. O nə doğmuş, nə də doğulmuşdur. Onun heç bir tayı-bərabəri, bənzəri də yoxdur!”** (əl-İxlas, 1-4).

**Onun zatı və sifətləri, məxluqlarının zatlarına və sifətlərinə bənzəmir**

Allahın zatı məxluqların zatlarına bənzəmir. Həmçinin, Onun sifətləri də məxluqların sifətləri ilə eyni deyildir. Allah elə bir mükəmməl varlıqdır ki, Ondan sonra mükəmməl olan yoxdur. Hər bir məxluqda zəiflik və başqasına ehtiyacı üzündən hər hansı bir nöqsan vardır. Allah-təala özü ilə məxluqu arasındakı bənzərliyi rədd edərək deyir: **“Ona bənzər heç bir şey yoxdur. O, eşidəndir və görəndir!”** (əş-Şura, 11).

**2. Allah-təalanın nəfsi**

Allah-təalanın Onun kamil və ülvi sifətlərinə layiq olan nəfsi vardır və bu məxluqların nəfslərinə bənzəmir. Allah-təala bu barədə öz Kitabında bizə hökmlə bildirir: **“**(Ya Məhəmməd!) **ayələrimizə iman gətirənlər yanına gələndə onlara de: “Sizə salam olsun! Rəbbiniz Özü Özünə rəhmli olmağı vacib bilmişdir ki, sizlərdən bir kəs pis iş görsə, sonra da tövbə edib düzəlsə** (Allah onu bağışlar)**. Şübhəsiz ki, Allah bağışlayan və rəhm edəndir”** (əl-Ənam, 54). Eyni fikir əl-Ənam surəsinin 12-ci, Ali-İmran surəsinin 30-cu və əl-Maidə surəsinin 116-cı ayələrində də vardır.

**3. Allah-təalanın üzü (camalı)**

Allah-təalanın yaratdıqlarının üzünə bənzəməyən üzü (camalı) vardır. Biz onu qəbul edib ona inanırıq. Çünki Allah bizə bu barədə Qurani-Kərimdə, Peyğəmbər (s.a.v.) isə öz hədislərində bu barədə danışır. Allah-təala buyurur: **“Yalnız kəramətli və əzəmətli Rəbbinin üzü** (camalı, zatı) **qalır”** (ər-Rəhman, 27). (Bu ayənin ərəbcəsində “li” şəkilçisi onun simasına mənsub əlamətləri göstərir. Buna görə də mənsubiyyət bildirən “li” şəkilçisi işlədilir. İbn əl-Cərir bu ayəni belə təfsir edir).

**Allah-təalanın camalına imanın təsiri**

***a) Bu simaya (camala) əməllə üz tutmaq:***

Allahın verdiyi qərarı bildikdə biz öz əməllərimizlə Rəbbimizə üz tutmalıyıq. Allah-təala Qurani-Kərimdə bizi bu yola yönəltmişdir. Ona üz tutmayan əməl isə batil hesab edilir: **“Onun simasından başqa hər şey məhvə məhkumdur”** (əl-Qəsəs, 88).

Buna görə də mal-dövlət yalnız Ona üz tutularaq sərf edilməlidir: “**Allahın üzünə** (rizasını diləyərək) **zəkat verənlərin** (mükafatı) **qat-qat artacaqdır**” (ər-Rum, 39).

***b) Allah-təalanın üzündən (camalından) kömək diləmək:***

Əli ibn Əbu Talibdən rəvayət edilir: *«Rəsulullah (s.a.v.) mənə bunu əmr etmişdir: “Yatağına girəndə bu sözləri de: – Nazil etdiyin şərdən qorunmaq üçün Sənin kəramətli üzündən və kamil kəlamlarından kömək diləyirəm”»* (əl-Beyhəqqi, “Adlar və sifətlər” 1/307).

***v) Allahın camalını görmək istəyi:***

İbn Cərir, İbn Xüzeymə “Tovhid” kitabında və ən-Nisainin “Sünnə” əsərlərində deyilir ki, o (s.a.v.), bu duanı oxuyarmış: *“Allahım! Qeybi bilməyinlə, yaratmaq qüdrətinlə mənə xeyirli olan bir həyat bəxş et, əgər ölüm mənə xeyirdirsə, məni öldür. Allahım! Sənin qeyb qorxundan və şəhadətindən kömək diləyirəm. Qəzəb və razılıqda Sənin haqq və ədalət sözünü diləyirəm. Kasıblıq və zənginlikdə Səndən yol göstərmək diləyirəm. Səndən qurtarmaq bilməyən nemət diləyirəm. Səndən bitməyən göz işığı diləyirəm. Səndən qəzadan sonra razılıq diləyirəm. Ölümdən sonra həyat təravətini Səndən diləyirəm. Sənin üzünə baxmaq ləzzətini Səndən diləyirəm. Səninlə görüşə şövq bizi bədbəxtlikdən uzaqlaşdırır, fitnəni kənar edir. Allahım! Bizi imanla zinətləndir, bizi haqq yolunu tutanlardan et!”*

***q) Allahın üzünün örtüklü olması:***

Əbu Musanın rəvayətində deyilir: *“Rəsulullah (s.a.v.) buyurmuşdur: “Allah yatmır. O yatmamalıdır ki, payı artırsın və ya azaltsın. Gündüz görülən iş gecədən Ona çatır, gecə görülən iş gündüzdən Ona çatır. Onun hicabı nurdur. Əgər üzündəki pərdəni qaldırsa üzünün odunun dilləri Onun gözü dəyən hər şeyi yandırar”*. (İbn Xüzeymə “ət-Tovhid”. Müslim “Səhih” əsərində rəvayət edir. Əbu Küreyyib demişdir: “Onun hicabı nurdur”).

Bu pərdə bəndələri Allahın zatını dərk etməkdən ayırır. Bu heç də Allahın üzünü örtüb başqasını Onu görməkdən məhrum etmək demək deyildir. Belə fikir Allaha təslim olan üçün yaddır. Nə göydə, nə də yerdə Allahdan gizli qalan bir şey yoxdur. Lakin Onun nurunun (ziyasının) üstü məxluqları üçün pərdə ilə örtülmüşdür.

**4. Allahın iki əli vardır**

Allah-təala iki ələ malikdir ki, onlar Onun əzəmət və kamalına layiq olub məxluqların əllərinə bənzəmir. Allah buyurur: **“Xeyr, Onun əlləri açıqdır”** (əl-Maidə, 64).

a) Allahın Onun əllərini zikr etməklə mədhi:

Müslim öz “Səhih” əsərində Əli ibn Talibdən (r.a.) belə bir hədis verir: *“Rəsulullah (s.a.v.) namaza duranda istiftah (açılış) duasını oxuyarkən deyərdi: “Mən Sənin qarşındayam, Sənin əlindəyəm. Xeyir bütünlüklə Sənin əlindədir”*.

b) Allahın əliaçıq olması:

Allah-təala kəramətlidir. O, əliaçıqlığını nemətlər bəxş etməsi ilə göstərir: **“Onun hər iki əli açıqdır, istədiyi kimi sərf edər”** (əl-Maidə, 64).

Müslim öz “Səhih” əsərində Əbu Musa əl-Əşariyə (r.a.) istinadən belə rəvayət edir ki, Rəsulullah (s.a.v.) demişdir: *“Allah əllərini gecə açır ki, gündüz günahkarı tövbə etsin, gündüz açır ki, gecənin günahkarı günəş çıxanadək tövbə etsin”*.

v) Mərhəmətli Allahın Öz əli ilə yaratdığı şeylər:

Allah heç nədə aciz deyildir. O, bir şey yaratmaq istədikdə “Ol!” deməklə Onun rəğbətinə uyğun olaraq həmin şey yaranır. Allah öz əli ilə elə şeylər yaratmışdır ki, onlar məhz Onun kəramət və əzəmətinə, Onun qayğısına dəlalət edirlər. Allahın öz əli ilə yaratdığı və Onun kitabında və peyğəmbərinin (s.a.v.) sünnəsində adı çəkilən şeylər bunlardır:

**– Adəm:**

Allah-təala İblisə deyir: **“Mənim iki əlimlə yaratdığıma səcdə etməyinə nə mane olur?”** (Sad, 75).

**– Tövratı öz əli yazmışdır:**

Bəzi rəvayətlərdə Peyğəmbərin (s.a.v.) bu hədisi verilir: *“Sənin (Musa) üçün lövhələrdə hər şeyi çəkdi” və “Sənin (Musa) üçün Tövratı öz əli ilə yazdı”* (əl-Buxarinin və Müslimin “Səhih” adlı əsərlərində verilən hədis. Bu əsərlər bəzən “İki səhih” adlanır).

**– Öz əli ilə bir kitab yazıb yanında saxlamışdır:**

Əbu Hüreyrənin rəvayəti: *“Rəsulullah (s.a.v.) demişdir: “Allah xilqəti yaratmamışdan qabaq Öz əli ilə: “Mərhəmətim irəlidir” – yazmışdır”* (Digər bir yerdə deyilir: “Qəzəbimi qabaqlayır” – demişdir.) (əl-Buxari və Müslim).

**– Ədn bağlarını öz əli ilə əkmişdir:**

Əl-Beyhəqi “Sünnələr” əsərində xəbər verir ki, Rəsulullah (s.a.v.) məxluqlar üçün Ədn bağlarını Allahın Öz əli ilə əkdiyini bildirərək demişdir: *«Allah Ədn cənnətini xəlq edərək Öz əli ilə orada ağaclar əkdi. Ona (cənnətə): “Danış!” – dedi. Cənnət dedi: “Möminlər uğura çatdılar”»*

**Allah-təalanın əlinin əzəməti**

Allah Öz kitabında buyurur: **“**(Müşriklər) **Allahı lazımınca qiymətləndirmədilər. Halbuki, qiyamət günü yer bütünlüklə Onun ovcunun içində olacaq, göylər isə Onun sağ əli ilə büküləcəkdir”** (əz-Zumər, 67).

Hər iki “Səhih” əsərində Əbu Hüreyrədən (r.a.) Peyğəmbərin (s.a.v.) bu hədisi verilir: *“Allah qiyamət günü yeri ovucunun içinə alır və səma Onun sağ əli ilə bükülür. Sonra deyir: “Mən hökmdaram, bəs yerin hökmdarları haradadır?”»*

**Allahın hər iki əli sağdır**

Müslimin rəvayət etdiyi hədisdə deyilir: *“Qiyamət günü Allahın dərgahında ədalətli olanlar Rəhmanın sağ tərəfində nur minbərlərinə qalxacaqlar. Öz hökmlərində, ailə üzvlərinə münasibətdə və üzərinə götürdükləri vəzifələrdə ədalətli olanlar üçün Onun hər iki əli sağdır”*.

**5. Rəhmanın (Allahın) barmaqları**

Allah-təalanın heç bir məxluqun barmaqlarına bənzəməyən, Onun kamal və cəlalına layiq barmaqları vardır. Əl-Buxarinin və Müslimin “Səhih” əsərlərində Abdulla bin Məsudun (r.a.) bu rəvayəti verilir: *“Peyğəmbərin (s.a.v.) yanına bir yəhudi gəlib deyir: “Ey Məhəmməd! Allah səmaları, yeri, dağları, ağacları, rütubəti və bütün başqa məxluqatı barmaqla yaratmışdır. Onu silkələyərək demişdir: “Mən hökmdaram, Mən hökmdaram”. Peyğəmbər (s.a.v.) güldü, onun üzünün cizgiləri yəhudinin dediyi ilə razı olduğunu büruzə verirdi. O dedi: “Allahı lazımınca qiymətləndirmədilər. Yer bütünlüklə qiyamət günü Onun ovcunun içində olacaqdır”*.

**6. Allah-təalanın ayağı**

Biz bunu təsdiq etməli, təkzib etməməliyik. Çünki bu barədə Allah-təala bizə əl-Qələm surəsinin 42-ci ayəsində xəbər vermişdir. İbn Kəsir bu ayənin təfsirində yazır*:* “Əbu Səid əl-Xüdri Peyğəmbərdən (s.a.v.) bu hədisi eşitmişdir: *“Rəbbimiz öz ayağını göstərir, dünyada yalnız riyakarlıqla, şöhrət naminə səcdə edənlər qalır. Möminlər səcdə etməyə gedirlər, Onun arxasında vahid bir təbəqə halında olurlar”*. (Bu uzun və məşhur hədis olub hər iki “Səhih”də verilir).

**7. Allahın Ərşin üzərinə yüksəlməsi**

Ərş bütün yaradılmışların ən əzəmətlisidir. Allah-təala Öz Kitabının yeddi yerində Ərş məsələsinə toxunaraq demişdir: **“Rəhman Ərş(in üzərin)ə istiva etdi (yüksəldi)” (Taha, 5 və** başqaları).

Ərş dedikdə, Allahın yaratdıqlarından biri nəzərdə tutulur. Allah buyurur: **“Həmin gün** (Qiyamət günü) **sənin Rəbbinin Ərşini onların** (başı) **üstündə səkkiz mələk daşıyacaqdır”** (əl-Haqqə, 17).

**Ərşin əzəməti**

Allah-təala Ərşi əzəmətli kimi vəsf etmişdir: **“Əzəmətli Ərşin Rəbbi”** (əl-Muminun, 86).

Rəsulullah (s.a.v.) Ərşin əzəmətini iki cəhətdən bəyan etmişdir.

Birincisi, Ərşi daşıyan mələklərin əzəməti barədə xəbər verir. Əbu Davudun "Sünnə"sində səhih isnadlı bir hədisdə Rəsulullah (s.a.v.) deyir: *"Allah mənə Ərşi daşıyan mələklərin biri barədə danışmağa icazə vermişdir. Deməliyəm ki, onun qulağının ucu ilə boynunun arasındakı məsafə yeddi yüz ilə bərabərdir. Quş bu məsafəni qət etməkdə acizdir".* (Yəni ən iti sürətlə uçan quş 700 ilə belə bu məsafəni qət edə bilməz).

İkincisi: Rəsulullah (s.a.v.) Ərşin əzəmətini səmalar və yerlə müqayisədə onların nə qədər kiçik olduğunu göstərmişdir. Peyğəmbər (s.a.v.) buyurur: *"Yeddi səma Kürsü ilə müqayisədə səhraya atılmış bir həlqəyə bənzəyir. Ərşin Kürsü ilə müqayisədə üstünlüyü bu səhranın o həlqəyə nisbəti kimidir"* (əl-Beyhəqi, "Adlar və sifətlər", İbn Əbu Şeybə. Səhih hədisdir.)

Allah Ərşin üzərinə yüksəlməyinə və Ərşin Rəbbi olduğuna görə Özünü belə tərif etmişdir: **"O** (Quran)**, yeri və uca göyləri yaradan Allahdan nazil olmuşdur. Rəhman Ərş**(in üzərin)**ə yüksəldi"** (Taha, 4-5). Eyni fikir əl-Hədid, 4; əl-Buruc, 15-16; əl-İsra, 42; ət-Tovbə, 129; əl-Ənbiya, 23; əl-Muminun, 86-da da ifadə edilir.

**Ərşin üzərinə yüksəlməyin mənası**

Biz, Onun zatını dərk etməkdə aciz olduğumuzdan, Rəhmanın Ərşin üzərinə yüksəlməsini başa düşmürük. Lakin biz ərəb dilində "istiva" sözünün mənasını bilirik. Ərəblər bu sözlə dörd mənanı nəzərdə tuturlar: qərar tutmaq, yüksəlmək, ucalmaq, qalxmaq. İbn əl-Qeyyim bu mənaları açmışdır. (bax: əl-Hərrasın "Orta şərh" əsəri, səh. 80).

Bu metod isteva sözünün mənasını başa düşməyə imkan versə də, onun necə icra edildiyini göstərmir. Burada əməlisaleh sələflərin metodu köməyə gəlir. İmam Malikdən soruşurlar: "Rəhman Ərşin üzərinə yüksəldi. Necə yüksəldi?" İmam deyir: "İstevanın ərəb dilində mənası məlumdur. Onun necə həyata keçirilməsi məchuldur. Ona iman gətirmək vacibdir. Onun (necəliyi) haqqında sual vermək isə bidətdir".

**8. Allah haradadır?**

Allah-təala bizə bildirir ki, O, səmadadır, Ərşin üzərinə yüksəlmişdir: **“Göydə olanın** (Allahın) **yeri titrədib sizi onun dibinə göndərməyəcəyinə əminsinizmi? Yaxud göydə olanın sizin üstünüzə daş yağdıran bir yel göndərməyəcəyinə arxayınsınızmı? Onda Mənim sizi qorxutmağımın necə olduğunu mütləq biləcəksiniz”** (əl-Mulk, 16-17).

Rəsulullah (s.a.v.) öz Rəbbi barədə xəbər verərək bildirir ki, O, səmadadır. “İki səhih”də Əbu Səid əl-Xüdridən (r.a.) verilən hədisdə deyilir: “Rəsulullah (s.a.v.) demişdir: *“Mənə iman gətirmirsiniz? Mən səmada olanın vəkiliyəm, səhər-axşam mənə səmadan xəbərlər gəlir”*.

Abdulla bin Ömərin (r.a.) hədisində deyilir: *“Rəhm edənlərə Rəhman rəhm edir. Yerdə olanlara rəhm edin ki, səmada Olan da sizə rəhm etsin”*.

**Allahın səmada olması nə deməkdir?**

Belə dedikdə, heç də səmanın Onu əhatə etməsi fikri irəli sürülmür. Allah heç nə ilə əhatə edilə bilməz. Burada səma dedikdə, ülvilik, ən yüksək olan, hər şeydən üstdə olan nəzərdə tutulur. Allah-təala özünü məhz ən uca olan kimi vəsf etmişdir: **“Ən uca olan Rəbbinin adını pak və müqəddəs tutub şəninə təriflər de!”** (əl-Əla, 1). O, ən əzəmətli və ən uca olandır: **“... Ən uca və ən əzəmətli varlıq da Odur”** (əl-Bəqərə, 255).

Allah-təala Onun yaratdıqlarının üstündə olduğunu bildirərək deyir: **“Onlar öz üstlərində olan Rəbblərindən qorxurlar”** (ən-Nəhl, 50); **“O öz bəndələri üzərində hakimdir”** (əl-Ənam, 18). Peyğəmbər (s.a.v.) öz duasında Allahı belə mədh edir: *“Sən zahir olansan, Sənin üzərində bir şey yoxdur”*.

Zeynəb Rəsulullahın (s.a.v.) digər qadınlarına fəxrlə deyərdi: *“Sizi atalarınız ərə verib. Məni isə Allah yeddi səmanın üzərindən evləndirdi”*. (əl-Buxarinin səhih rəvayətidir. Məlumdur ki, Zeynəb Zeyddən boşandıqdan sonra Allahın əmri ilə Peyğəmbər (s.a.v.) onunla evlənmişdi. Bax: əl-Əhzab, 37). Müsəlman Allahın səmada olmasını Onun səma ilə əhatə edilməsi kimi başa düşməməlidir. Allah səmanın içində ola bilməz. O bütün bunlardan uca və ülvidir. Səmalar Ona nisbətdə heç nədir: **“...Səmalar isə Onun sağ əli ilə büküləcəkdir”** (əz-Zumər, 67).

**Allah yaratdıqlarından ən ucada olduğu kimi, həm də yaratdıqlarına ən yaxındır**

O, yaxındır, dua edənə cavab verir, onun sirrini və qəlbində olanı bilir. O, Ona dua edənə dəvəsinin boynu ona yaxın olandan da yaxındır. Bəndənin qəlbində yurd salan vəsvəsələrdən xəbərdardır. O, bəndəsinə şah damarından da yaxındır. O, sirli, məxfi olanı bilir. O, yerin dibində gizlənənlərdən də, ondan xaric olanlardan da, ona qalxanlardan da xəbərdardır. O, elmi və qüdrətilə yaratdıqları ilə birgədir. Onun üçün məchul heç nə yoxdur. Sənin Rəbbinin nəzərindən nə yerdə, nə səmada nə nəhəng bir misqal, nə də kiçik bir zərrə yayına bilməz. Allah-təala hər kəsdən uca olduğu kimi, hər kəsə ən yaxındır. O, əvvəl və axırdır, zahir və batindir.

**9. Allahı görmək**

Allah dünyada gözəgörünməzdir. Musa Allahı gözlə görmək niyyətində olarkən Rəbbi ona bildirir ki, Onu dünyada görə bilməz. Bu mümkün deyildir, hətta möhkəm və güclü dağ belə buna dözə bilməz: «**Musaya vəd etdiyimiz vaxt gəlib çatanda Rəbbi onunla danışdı.** (Musa:) **“Ey Rəbbim! Özünü** (camalını) **mənə göstər Sənə baxım!” – dedi. Allah: “Sən Məni görməyəcəksən. Lakin dağa bax. Əgər o yerində dura bilsə, sən də Məni görə bilərsən” – deyə buyurdu. Rəbbi dağa nur saçdıqda o parça-parça oldu. Musa da bayılıb düşdü**» (əl-Əraf, 143).

Qiyamət günü möminlər Allahı görəcəklər. Cənnətdə bəndələrə bəxş ediləcək ən böyük nemət əzəmətli və kəramətli Allaha baxmaqdır. Bu böyük nemətdən kafirlər məhrumdurlar: **“Yox, onlar** (kafirlər) **həmən gün** (qiyamət günü) **öz Rəbbinin** (kəramətindən) **məhrumdurlar”** (əl-Mutəffifin, 15). **“O gün neçə-neçə üz öz Rəbbinin**

**cəmalına baxıb sevinəcəkdir”** (əl-Qiyamə, 22-23). Bu adamlar möminlərdir: **“Həqiqətən, yaxşı əməl və itaət sahibi olan möminlər Nəim cənnətlərində olacaqlar. Sən** (ey Peyğəmbər!) **onların üzlərində cənnət sevinci görəcəksən”** (əl-Mutəffifin, 22, 24). Allah-təalanın mübarək üzünə bu nəzər möminlərə vəd edilmiş əlavə mükafatdır: **“Yaxşı işlər görənləri Cənnət və daha artıq mükafatlar gözləyir”** (Yunus, 26). Hər iki “Səhih”də Cərir bin Abdulladan (r.a.) bu hədis verilir: “Peyğəmbərlə (s.a.v.) oturmuşduq. Ayın 14-də gecə aya baxdıq. O dedi: *“Siz öz Rəbbinizi bunu gördüyünüz kimi görəcəksiniz. Ona baxmaqla zərər görməzsiniz. Əgər bacarsanız günəş çıxmamışdan namaza çox uymayasınız (bu namazı gecikdirməyin) və günəşin qürubuna qədərki namaza əməl edin”*.

**Allahın adlarını və sifətlərini başa düşməyə imkan verən yol**

Mərhum Şeyx Məhəmməd əl-Əmin əş-Şanqiti demişdir ki, əzəmətli Quran göstərir ki, sifətlərin tədqiqi üç əsas üzərində cəmlənir. Bu əsasların hər üçünü qəbul edən savab etmiş olur. Peyğəmbərin (s.a.v.), onun səhabələrinin və əməlisaleh sələflərinin əqidəsi məhz belə olmuşdur. Bu üç əsasdan birinə qarşı çıxan yolunu azmış olur.

Quranın göstərdiyi hər üç əsas bunlardır:

**Birinci:** Qüdrət və cəlal sahibinin sifətlərindən hər hansı birini məxluqların sifətlərinə bənzətməkdən uzaq olmaq. Allah-təalanın kəlamı bunu sübut edir: **“Onun bənzəri, tayı-bərabəri yoxdur”** (əl-İxlas, 4); **“Allaha bir misal** (bənzər) **gətirməyin”** (ən-Nəhl, 74).

**İkinci:** Allaha Onun Özünü vəsf etdiyi kimi iman gətirmək. Çünki bunu heç kim Onun Özündən yaxşı edə bilməz: **“Siz daha çox bilirsiniz, yoxsa Allah?”** (əl-Bəqərə, 140). Allaha Onun peyğəmbərinin (s.a.v.) Allahı vəsf etdiyi kimi iman gətirmək. Bu barədə isə Allah buyurur: **“O, havadan danışmır. Bu ancaq nazil olan bir vəhydir”** (ən-Nəcm, 3-4).

Cəlal və ülviyyət sahibi Allahın sifətlərindən birini başqa bir məxluqa aid etməkdən uzaq olan şəxs təşbihə (oxşatma) və tətilə (inkar etmək) yol verməyən və bununla özünə zülm etməkdən yaxa qurtarmış pak mömindir. Bunu Allahın kitabından olan ayə də sübut edir: **“Onun mislində heç bir şey yoxdur, O eşidəndir və görəndir”** (əş-Şura, 11). Bu ayədə bütün suallara konkret cavab vardır.

Məlumdur ki, bir duyğu kimi eşitmə və görmə bütün canlı varlıqlarda mövcuddur. Bununla belə Allah öz məxluqlarına bildirir ki, Onun eşitmə və görmə sifətlərini inkar etməsinlər. Bunu belə bir iddia ilə əsaslandırırlar ki, hədislər eşidilir və görünür. Bu isə bənzətmədir. Allahın görmə və eşitmə sifətləri Onun mislində bir şeyin olmaması əsasında sübuta yetirilməlidir.

Cəlal və ülviyyət sahibi Allahın Onun kamalına və cəlalına layiq sifətləri vardır. Bu da danılmaz bir həqiqətdir ki, səmaların və yerin Rəbbinin sifəti məxluqların sifəti ilə müqayisədə daha ali və kamildir.

**Üçüncü:** İnsan idrakı bütün hadisələrin baş verməsinin həqiqətini, necə icra olunmasını bilmək istəyir. Lakin Allahın işlərində bu necəliyi bilmək mümkün deyildir. Bunu O: “(Rəbbin) **onların keçmişini də, gələcəyini də bilir. Onların elmi isə onu əhatə edib qavraya bilməz!”** (Taha, 110) ayəsində bildirir.

İnsan öz daxilində yurd salmış ruhun ən bariz əlamətlərindən olan nurun (ziyanın), ibarət olduğu maddənin, maddələri təşkil edən atomların həqiqətini bilməkdə aciz olduğu halda ilahi zatın və sifətlərin həqiqətini bilməyə necə cəhd edir?

**Allahı tanımaq məsələsində doğru yoldan azmağın səbəbləri:**

Allahın adları və sifətləri məsələsində doğru yoldan azmaq yuxarıda qeyd etdiyimiz üç əsasdan birinə qarşı çıxmaqdan irəli gəlir. Həm keçmişdə, həm də indinin özündə insanların bu yoldan azmasının əsas səbəbləri üçdür:

1. Müşriklərin yol azması. Bu barədə İbn Abbas, İbn Cərir və Mücahid: “Müşriklər Allah-təalanın adlarını dəyişdirib onları öz bütlərinə vermişlər. Belə ki, Allah adını əl-Lat

bütünə, əl-Əziz (Güclü) adını əl-Üzza bütünə, əl-Mənnan (Səxavətli) adını Mənat bütünə vermişlər" – demişlər.

2. Təşbih edənlərin yol azması. Beləlәri özlərində olanları Allaha da şamil edərək Allahı məxluqlara bənzədirlər. Bu adamlar hətta elə sözlər deməyə cürət edirlər ki, bu onların axirəti üçün çox təhlükəlidir. Onlardan eşitdiyimiz: "Allahın bizim əlimiz kimi əli, qulağımız kimi qulağı, gözümüz kimi gözü vardır" – kimi ifadələr buna aiddir. Halbuki, Allah-təala onların dediklərindən çox uzaq və pakdır:

3. İnkar edənlərin yol azması. Beləlәri də üç qrupdur:

a) Adları inkar edənlər. Onlar bu adların daşıdığı mənaları da inkar edərək Allahı tam heçlik kimi vəsf etmişlər. Bunlar cəhmiyyəçilərdir.

Onlar da Allahı kafirlər kimi təkzib edirlər.

b) Adları qəbul edib, lakin məzmununda kamilliyi inkar edənlər. Bu barədə onlar deyirlər: "Mərhəmətsiz rəhman və rəhim olan" və s. Bunlar mötəzililərdir.

v) Yalnız yeddi sifəti (həyat, elm, qüdrət, iradə, eşitmə, görmə və kəlamı) qəbul edib başqalarını inkar edənlər bu qrupa aiddirlər. Beləlәri əşarilərdir. Qeyd etmək lazımdır ki, sufilərlə əşarilər sifətləri qruplaşdırmaqda eyni mövqedə dururlar. Bu da onların yol azmalarının səbəblərindəndir. Şeyx Əbu-l-Həsən əl-Əşari bu qrupları aydınlaşdıraraq demişdir: "Kəlamla məşğul olan mütəkəllimlər əqli dəlillərə, məntiqi ölçülərə əsaslanaraq Allahın sifətlərini altı qrupa bölmüşlər: nəfsi sifət, mənəvi sifət, səlbi (mənfi) sifət, məna sifəti, əməl sifəti, cəm sifəti".

**Allahı tanımaq məsələsində Sünnə və camaat əhlinin mövqeyi**

İbn Teymiyyə əməlisaleh sələflərin məzhəbini belə ifadə etmişdir: "Bu məzhəb belə bir prinsipə əsaslanır ki, biz Allahı yalnız Onun Özü Özünü, Onun peyğəmbərinin (s.a.v.) Onu bizə tanıtdırdığı kimi tanımalıyıq. Bura həm isbat, həm də inkar daxildir. Allaha Onun Özünə aid etdiyi aid edilir, Onun inkar etdiyi inkar edilir.

Məlumdur ki, ümmətin sələflərinin və imamlarının yolu necəlik barədə sual qoyulmadan və bənzətmə olmadan, təhrifsiz və tətilsiz sifətlərin isbatı yoludur. Tətil sifətlərə inamsızlıq deməkdir. Allah bizi Allahın Öz kitabında iqrar etmiş olduğu adlar və sifətləri təhrif etməkdən çəkindirmişdir. Allah-təala buyurur: **"Allahın gözəl adları vardır, Onu bu adlarla çağırın, Onun adlarını inkar edənləri bu işdən çəkindirin"**. Allah-təala dinsizlərin və müşriklərin Onu vəsf etdiklərindən Özünü uzaqlaşdıraraq demişdir: **"Allah** (müşriklərin) **Ona şamil etdikləri sifətlərdən tamamilə uzaqdır"** (Əs-Saffat, 159). Və ya **"Sənin yenilməz qüvvət sahibi və hər şeyə qalib olan Rəbbin** (müşriklərin) **Ona aid etdikləri sifətlərdən tamamilə uzaqdır"** (əs-Saffat, 180).

Bütün belə oxşatmalardan doğruçu insanlar istisna edilir: "**Yalnız Allahın sədaqətli bəndələri müstəsnadır**". Başqa bir ayədə Allah Onu vəsf edənlərin dediklərinin doğruluğuna görə onlara salam göndərir: **"Peyğəmbərlərə salam olsun!"** (əs-Saffat, 181).

"İslam Nuru"(dini risalələr) kitabından